UOT: 334.012; 334.7

# AQRAR SAHİBKARLIĞIN İNKİŞAFINDA QİYMƏT AMİLİNDƏN İSTİFADƏNİN TƏKMİLLƏŞDİRİLMƏSİ

**A.R.SÜLEYMANOVA**
**Azərbaycan Kooperasiya Universiteti**

*Hər bir ölkədə aqrar sahibkarlığın inkişafı ilkin mərhələdə bir sıra ehtiyacların ödənilməsini tələb edir. Bunlar maddi, texniki, hüquqi və təşkilati dəstəklə bağlı ola bilər. Sahibkarların əsas probleminin bəzən istehsalın artırılması olması hesab olunduğundan satış məsələsi unudulur. Nəzərə almaq lazımdır ki, satışın nəticələri təkrar istehsala müsbət və ya mənfi təsir göstərə bilər. Bu da qiymət mexanizmi ilə bağlıdır. Bunu nəzərə alaraq təqdim olunan məqalədə aqrar sahibkarlıq fəaliyyətinin stimullaşdırılmasında qiymət amilindən istifadə istiqamətləri əsaslandırılmışdır.*

***Açar sözlər:*** *sahibkarlıq, maliyyə, kredit, lizinq, qiymət, ixrac, idxal, kvota.*

Respublikamızda aqrar sahibkarlığın inkişafına son illərdə daha yüksək diqqət yetirilir. Bu da daha çox dünya bazarında neftin qiymət tərəddüdlərindən sonra ərzaqla özünütəminat səviyyəsinin və ixrac potensialının yüksəldilməsi vəzifələrindən irəli gəlir. Bu vəzifələrin həlli aqrar sahibkarlıq subyektlərinin maliyyə təminatı, investisiyalaşdırma, sığorta, satış və ixracla bağlı problemlərinin həllini tələb edir. Qeyd olunan istiqamətlərdə aparılan islahatlar tədricən öz bəhrəsini versə də hələlik arzuolunan nəticələrə nail olunmamışdır. Ona görə ki, aqrar ərzaq məhsullarının isthesal maya dəyəri və qiyməti arasındakı nisbətlər onların rentabelliyini təmin etmir. Bu da öz növbəsində əsas növ kənd təsərrüfatı məhsullarının (o cümlədən, ixracyönümlü) məhsulların qiymətlərinin tənzimlənməsinə yeni yanaşmaların tətbiqi məsələsini qarşıya qoyur.

Aqrar sahədə hələ də zərərlə işləyən müəssisələrin olması, ixracyönümlü sahələr daxil olmaqla təsərrüfatların əksəriyyətində rentabelliyin optimal səviyyəsinin əldə edilməməsiişçi qüvvəsinin şəhərlərə və ya xarici ölkələrə miqrasiyası ilənəticələnir. Bu proseslərin qarşısının alınması üçün maliyyə resurslarının formalaşdırılması və bölgüsü mexanizmi yeniləşdirilməlidir.

Qeyd oluna bilər ki, müstəqillik dövrünə qədər kənd təsərrüfatında maliyyə münasibətlərinin bəsit təzahür formaları müşahidə olunurdu. Birgə ictmai təsərrüfatlarda iqtisadi resurslar hesabına müvəffəqiyyət əldə etmək cəhdləri artıq uğursuzluqla nəticələnmişdir. Ona görə ki, bu şaquli inteqrasiyanı və iqtisadi-təsərrüfat əlaqələrinin inkişafını təmin etmirdi. Lakin yeni iqtisadi münasibətlərin formalaşması, tənzimlənən bazar münasibətlərinin təşəkkülü aqrar sektorun inkişafını önə çəkməyi tələb edir. Aqrar sektorun istehsal-maliyyə fəaliyyətinin qiymətləndirilməsi üçün müxtəlif göstəricilər sistemindən istifadə edilməlidir. Bu göstəricilərin seçimi həm nəzəri metodoloji, həm də təcrübi baxımdan aqrar sahibkarlığın maliyyə təminatının və kredit şərtlərinin qiymətlərin səviyyəsinə təsirini müəyyən etməyə imkan verməlidir.

Aqrar sənaye sistemində maliyyə təminatının hərtərəfli qiymətləndirilməsi göstərir ki, o, aqrar sahibkarlığa maliyyə dəstəyi ilə əlaqədar kompleks problemləri sahibkar təkbaşına həll etmək imkanına malik deyildir. Əslində dövlət maliyyə təminatı ilə əlaqədar problemlərin həllində sahibkarlara stimullaşdırıcı dəstək verilməli, bu işdə qeyri-hökumət təşkilatları və ictimai birliklərinin potensial imkanlarından fəal şəkildə istifadə edilməli və tənzimlənmə prosesi bütövlükdə koordinasiya olunmalıdır.

Aqrar sahənin maliyyə-kredit təminatının yaxşılaşdırılması istiqamətində Dünya Bankının "Təsərrüfatların özəlləşdirilməsi" layihəsi üzrə minlərlə sahibkara böyük məbləğdə kredit verilmişdir.“Kənd ərazilərinin və aqrar qurumların inkişafı üzrə Beynəlxalq Fond”la Azərbaycan hökuməti arasında aqrar sahənin regional inkişafı üzrə razılaşmalar da müsbət nəticələr vermişdir.

Sahibkarların investisiya layihələrində iştirakı imkanlarını stimullaşdırmaq üçün dövlət büdcəsi vəsaitlərinin məqsədli istifadəsi üzrə formalaşmış təcrübə mövcuddur. "2014 – 2018 – ci illərdə Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı DövlətProqramı"na uyğun olaraq respublikanın rayonlarında investisiya layihələrinin maliyyələşdirilməsi nəzərdə tutulmuşdur. Aqrarsahəyə investisiya qoyuluşları ilə yanaşı maliyyə vəsaitlərindən istifadə səmərəliliyidə yüksəldilməlidir.

Aqrar sahibkarlığın maliyyə təminatında perspektivli istiqamətlərin seçilməsi xüsusiyyətləri müxtəlif səviyyələrdə fərqli ola bilər. Bu baxımdan aqrar sahibkarın maliyyə imkanlarının aşağı olması amili əsas kimi qəbul edilməlidir.Aqrar sahibkara dəstək formasının seçilməsində bu amil nəzərə alınmalıdır.

Aqrar sferanın kompleks inkişafını təmin etmək üçün lizinq xidmətləri şəbəkəsinin formalaşdırlması mütləqdir.Onun özünəməxsus üstünlükləri vardır. Beləki, lizinq obyekti ödəniş qabiliyyətinin itirilməsindən etibarlı şəkildə sığorta edir və lizinq şirkəti istənilən zaman öhdəliyin ödənilməsi üçün əmlakı geri almaq imkanına malik olur. Bu amil özlüyündə aqrar sahədə sahibkarların kreditin lizinq formasından istifadəsi üzrə imkanlarını genişləndirir.Lizinq icarəçiyə böyük məbləğdə kapital sərf etmədən müasir texnikadan istifadə etməyə və icarə haqqını tədricən həmin avadanlıqların istifadəsindən əldə edilən mənfəət hesabına ödməyə imkan verir.

Aqrar sferada həyata keçirilən tədbirlər ümumi şəkildə məhsulun maya dəyərinin aşağı salınmasına, keyfiyyətinin yüksəldilməsinə və rəqabət qabiliyyətinin artırılmasına xidmət etməlidir. Göstərilən tədbirlər ardıcıl olaraq məhsulun qiymət səviyyəsində özünü büruzə verir. Son dövrlərdə əsas növ məhsulların topdansatış və tədarük qiymətlərinin tənzimlənməsi, eləcə də əlavə subsidiyaların ödənilməsinin istehsal və ixracın həcminə multiplikativ təsirini bunu bir daha təsdiq edir. İstənilən halda "maya dəyəri - keyfiyyət - qiymət - mənfəəti" asılılığının optimal həlli aqrar istehsalçılarının mənafeyinə xidmət etməlidir.

Azərbaycanda aqrar sahibkarlığın inkişafında qiymət mexanizmindən istifadənin təkmilləşdirilməsi aqrar sahibkarlıqda ilk növbədə sudan, texnikadan, kimyəvi dərman və gübrələrdən istifadə məsələlərində öz optimal həllini tapmalıdır.

Aqrar sahibkarlığın inkişafında büdcə-maliyyə və pul-kredit siyasətinin aqrar-sənaye sistemində maliyyə təminatı və kredit şərtlərinin qiymətlərin səviyyəsinə təsirində aşağıdakı məsələlər həll olunmalıdır:

- respublikada aqrar sahibkarlığın idxalla rəqabət qabiliyyətinin yüksəldilməsi onun maliyyə təminatının yaxşılaşdırılması istiqamətində aparılan tədbirlər davam etdirilməlidir;
- regionlarıda ixracyönümlü aqrar məhsulların istehsalı və emalının stimullaşdırılması mexanizmi təkmilləşdirilməlidir;
- bankları aqrar sahəyə fəal nüfuz etməsi üçün normativ-hüquqi baza və əmlakın girov qoyulması mexanizmi təkmilləşdirilməlidir.

Aqrar-sənaye sistemində maliyyə təminatının yaxşılaşdırılması üçün sahıbkarların könüllü birləşməsi prosesinin araşdırılması vacibdir. Hazırda aqrar sahibkarlıq fəaliyyətinin daha səmərəli məqsədyönlü təşkili üçün kredit kooperativlərinin yaradılması geniş yayılmışdır. Aqrar sahibkarlar ərazi xüsusiyyətləri nəzərə alınmaqla, taxılçılıqla, yemçiliklə, heyvandarlıqla, südçülüklə, emalla və digər sahələrə göstərilən müvafiq xidmətlə məşğul olmalarını bilməlidirlər. Bütün maraqların yerinə yetirilməsi məqsədilə onlar könüllü birləşərək müxtəlif kooperativlər yaratmalı və fəaliyyət göstərməlidirlər.

İnkişaf etmiş ölkələrdə aqrar bazarın qorunması dövlət siyasətinin mühüm istiqamətidir.Tənzimlənən daxili bazarda sabitlik və bolluq, sosial-iqtisadi inkişaf problemlərinin həllinin şərti və nəticəsi kimi çıxış edir.Daxili bazarda tarazlı inkişaf xeyli dərəcədə sahibkarlara əlverişli fəaliyyət yaratmaqla əldə edilir.

Aqrar sahibkarlığın tənzimləmə istiqaməti struktur siyasəti dövlətin məqsədyönlü iqtisadi strategiyasına əsaslanmaqla tamamlanmış və sistemli xarakter daşımalıdır.Əsas diqqət daxildə və xaricdə yüksək rəqabət aparmaq qabliyyətinə malik sahələrin stimullaşdırılması şərti ilə iqtisadi fəaliyyətin bütün növlərinə əlverişli şərait yaradılmasına yönəldilməlidir.

Ümumiyyətlə, aqrar bazarın qorunmasında dövlət siyasətinin əsas məqsədi uzunmüddətli perspektiv üçün istehsal olunan yerli əmtəələrin (iş və xidmətlərin) rəqabət qabliyyətinin daxili və xarici bazarda yüksəldilməsi, bazarın tələbinə uyğun istehsalın strukturunda dəyişikliklərə şərait yaradılması və təmin edilməsi, maddi-texniki resurslar, iş və xidmətlər sferasında aqrar bazar əlaqələrinin səmərəliliyinin yüksəldilməsi, bu əlaqələrin stabil inkişafına əlverişli zəmin yaradılması kimi çox mühüm məsələlərin müəyyənləşdirilməsi və həllindən ibarətdir. Bu məqsədə çatmaq imkanları faktiki olaraq orta və uzun müddətli dövr üçün hazırlanmış optimal istehsal-satış strukturunun formalaşması tədbirləri, habelə bu qiymət siyasəti reallaşdırmaq üçün dövlətin malik olduğu vasitə və mexanizmlərlə sıx bağlıdır. Dövlətin iqtisadi siyasətinin tərkibində aqrar bazarın qorunmasının aşağıdakı istiqamətləri vardır:

- bütün subyektlərin iqtisadi fəaliyyəti üçün yalnız iqtisadiyyatın müxtəlifsferalarında deyil, həmçinin ayrı-ayrı bazarlar səviyyəsində, bərabər və normal rəqabət mühitinin yaradılması;
- həm makro vəhəm də mikro səviyyədə iqtisadi inkişafın stimullaşdırılması məqsədi ilə idxal-ixrac əməliyyatlarından və digər vasitələrdən geniş şəkildə istifadə olunması;
- əmtəəlik məhsul istehsalı ilə məşğul olan bütün təsərrüfat formalarının fəaliyyətinin dəstəklənməsi (maliyyə, texniki, material resursları ilə təminat və s.) və onlar arasında inteqrasiyanın stimullaşdırılması.

Məlumdur ki, əmtəəlik məhsul istehsal edən, iş və xidmətlər təklif edən təsərrüfatlarda investisiya çatışmazlığı müşahidə olunduğu hallarda gəlirlərin əldə olunması və sahələr arasında bölgüsündə kəskin fərqlər yaranır, nəticədə istehsal (təklif) həcmində azalmalar baş verir və bazar tələbatının ödənilməsində problemlər yaranır.

Daxili aqrar bazarın qorunması və inteqrasiya prosesləri ilə sıx qarşılıqlı əlaqədə xarici, xüsusilə Avropa təcrübəsi əlamətdardır. Azad ticarətdən daha çoxmənfəət əldə etməyə çalışan ölkələrin bu istiqamətdəki uğrları, onları iqtisadi qüdrəti ilə düz mütənasibdir. Belə ki, bazarlar genişləndikcə səmərəli istehsal üçün daha əlverişli şərait yaradır. İnteqrasiya prosesləri gündən-günə gücləndiyi şəraitdə daxili aqrar bazarın qorunması və inteqrasiya prosesləri arasında optimal nisbət axtarışı zəruridir.

Müasir inkişaf mərhələsində aqrar sferada sahibkarlıq fəaliyyətini məhdudlaşdıran əsas amil maliyyə vəsaitlərinin azlığıdır. Bu problemin həllində dövlət həmin dövrdə imkanlarının məhdudluğu üzündən lazımi səviyyədə iştirak edə bilmir. Dövlətin iştirakı olmadığı halda kənd təsərrüfatında geriləmələr kənd əhalisinin kütləvi surətdə şəhərlərə və xarici ölkələrə miqrasiyasına səbəb olur.

Aqrar sferaya dövlət müdaxiləsinin əsaslandırılmış formalarının tətbiqi düşünülmüş qiymət siyasəti tələb edir. Aqrar sahibkarlığın inkişafında təminatlı qiymət mexanizmininrolu obyektiv dəyərləndirilməlidir.

Ərzaq məhsulları bazarında dövlətin rolunun artırılması, kənd təsərrüfatında qiymət səviyyəsinin qalxıb-enməsi ilə bağlı problemlərdən asılılığın qarşısının alınmasına imkan verər. Məlumdur ki, ərzaq məhsulları bazarında qiymətlərin qalxıb-enməsi əsasən kənd təsərrüfatı məhsulları istehsalının mövsümi xarakterliliyindən və təbii amillərdənasılı olması ilə səciyyələnir" [2, səh.11].

Aqrar sahibkarların qeyri-ekvivalemt mübadilə prosesində məruz qaldıqları zərəri aradan qaldırmaq üçün dövlət paritet qiymətləri dəstəkləməlidir. Müvafiq qiymətlər məhsulun rentabelliyinin məqbul səviyyəsini təmin etməlidir.

Daxili bazarın qorunmasına yönəldilən müvafiq tədbirlərin reallaşması mexanizmi kifayət qədər mürəkkəbdir. Belə ki, qiymətlərə müdaxilənin iqtisadi inkişaf motivlərinə zidd olmaması üçün konkret zaman və məkan parametrləri hər dəfə yenidən nəzərdən keçirilməli, baş verən dəyişikliklərə adekvat reaksiya verilməlidir.

Qloballaşma şəraitində aqrar dövlət himayəsinin təsiri istiqaməti kimi idxalın strukturunun təkmilləşdirilməsinin xüsusi əhəmiyyəti vardır. Belə yanaşma bəzi hallarda təkcə kənd təərrüfatı məhsullarının idxalı parametrlərinin deyil, həmçinin onların istehsalı üçün zəruri olan texniki və digər vasitələrin idxalı vəziyyətinin yenidən qiymətləndirilməsini tələb edir. İdxalın həcmində kənd təsərrüfatı texnikasının xüsusi çəkisinin artma meyli müşahidə olunsa da, bu proses intensiv texnologiyaların tətbiqində keyfiyyətcə yeni səviyyənin əldə edilməsi üçün kifayət qədər deyildir. Daxili bazarda həmin texniki vasitələrə ödəmə qabiliyyəti tələbinaşağı səviyyəsi də az rol oynamır [3, səh.113].

Hazırda aqrar sahibkarların maliyyə vəziyyyətinə adekvat yanaşmalara, o cümlədən lizinqin tətbiqinə münasibət daha konstruktiv və differensillaşmış olmalıdır. Müvafiq məsələlərdə əsaslandırılmamış ümumiləşdirmə, sahibkarlığın inkişaf tempinə və fəaliyyət miqyasına ciddi təsir göstərə bilər"... kənd təsərrüfatı məhsullarının dünya qiymətləri, bir qayda olaraq, həmin məhsulların ən yaxşı istehsal şərtləri ilə müəyyən edilir. Azərbaycan əsas məhsul növlərinin istehsalı üzrə bu cür şəraitə malik deyildir.

Aqrar-ərzaq bazarının qorunması kənd təsərrüfatı və onunla sıx qarşılıqlı əlaqədə olan sahələrin inkişaf potensialının fəallaşması dərəcəsindən bilavasitə asılıdır.Mövcud patensialın fəallaşdırılması üçün torpağın münbitliyinə münasibətdən tutmuş, hüquqi normativ bazanın təkmilləşdirilməsinə qədər geniş məsələlər qrupu əhatə olunmalıdır.

Maliyyələşmə mənbələrinin genişləndirilməsini; aqrar bölməyə sifarişlə işləyən sahə kimi münasibət göstərilməsini və müvafiq mexanizmin yaradılmasını; fermer gəlirlərinin azalması probleminin aradan qaldırmasını, təsərrüfatların məqbul rentabellik səviyəsinin təmin edilməsi üçün paritet qiymətlərin dəstəklənməsini; kənd təsərrüfatı məhsulları istehsalçılıarına ünvanlı yardımların çatdırılması mexanizminin təkmilləşdirilməsini və s. həmin tövsiyyələrə aid etmək olar.

İqtisadi sərhədlər daxili istehsalçılara dövlət himayəsi mexanizminin reallaşdırıldığı mühüm məkandır və Azərbaycanda bu məkanda həyata keçirilən səmərəli və davamlı tədbirlər öz müsbət nəticələrini göstərir.Daxili ərzaq bazarının qorunmasının digər yolu idxal kvotalarıdır. Məsələn, adətən, azad ticarət əlaqələrini, açıq iqtisadiyyatı və intensiv inteqrasiyanı təbliğ edən ABŞ-da əsas heyvandarlıq və bir çox bitkiçilik məhsullarının idxalına kvotalar tətbiq olunmaqdadır.

Son onillikdə inkişaf etmiş ölkələr və beynəlxalq təşkilatlar kənd təsərrüfatı məhsullarının qiymətlərinin tənzimlənməsinə, bu məqsədlə verilən subsidiyalara ehtiyatlı yanaşmağı tövsiyyə edirlər. İnkişaf etmiş ölkələrin əksəriyyətində son dövrdə kənd təsərrüfatına sistemli maliyyə dəstəyi verilmiş, aqrar sahənin inkişafı üçün etibarlı zəmin yaradılmışdır. Bu baxımdan qabaqcıl ölkələrin tövsiyyələrinin inkişaf etməkdə olan ölkələr tərəfindən birmənalı qəbul edilməməsinin səbəbləri üzə çıxır.

**Nəticələr.** Müasir dövrdə aqrar sektorda bu və ya digər sahənin üstün inkişafına şərait yaradılması, onun tamamilə bazar mexanizmlərinin öhdəsinə buraxılması təklif həcmində yaranan çatışmazlığın idxal malları hesabına ödənilməsini şərtləndirir.. Bunun başlıca səbəbi idxal olunan kənd təsərrüfatı məhsullarının yerli mallara nisbətən ucuz başa gəlməsi və satılmasıdır. Nəticədə idxal ərzaq məhsullarının keyfiyyəti lazımi tələblərə cavab verməsə də aşağı qiymət hesabına bazarda əhəmiyyətli və

davamlı mövqe tuta bilir. Ona görə də daxili bazarda aqrar istehsal məhsullarının qiymətlərinin aşağı salınmasını təmin edən bütün mümkün vasitələrdən və potensialdan istifadə olunmalıdır. Buna qiymətlərlə digər iqtisadi tənzımləyicilərlə qarşılıqlı əlaqə və asılılıqlarından əsaslandırılmış şəkildə istifadə olunmaqla nail oluna bilər.

**ƏDƏBIYYAT**

1. Alıyev İ.H., Məmmədova Ş.Ə. Aqrar sahənin inkişafının maliyyə mənbələri. Bakı, 2007. 2.Ataşov B.X.Aqrar sahədə struktur və səmərəlilik problemləri. Bakı 2017. 3. Əhmədov G. "Kənd təsərrüfatında innovasiyaların tətbiqi istiqamətləri", Bakı, 2010. 4.Salahov S.V. Aqrar sahənin dövlət tənzimlənməsi problemləri . Bakı , 2004. 5. Кулиев Р.А. Регулирование инвестиционный деятельности.Баку, 2008. 6. Перспективы реформирования аграрной политики России.Москва, , 2004.

**Совершенствования использования ценового фактора в развитии аграрного предпринимательства.**

**А.Р.Сулейманова**

Развитие аграрного предпринимательства в каждой стране требует ряда потребностей на начальном этапе. Они могут быть связаны с материальной, технической, правовой и организационной поддержкой. В настоящее время проблема продаж забыта, потому что основной проблемой предпринимателей иногда считается увеличение производства. Следует иметь в виду, что результаты продаж могут оказывать положительное или отрицательное влияние на воспроизводства. Это в свою очередь связано с ценовым механизмом. Учитывая это в представленной статье обоснованы направления использования ценового фактора в стимулировании аграрной предпринимательской деятельности.

***Ключевые слова:****предпринимательство, финансы, кредит, лизинг, цена, экспорт, импорт, квота.*

.

**Improve the use of price factor in the development of agrarian entrepreneurship.**

**A.R.Suleymanova**

The development of agrarian entrepreneurship in each country requires a number of needs at the initial stage. These may be related to material, technical, legal and organizational support. The sales problem is forgotten because the main problem of entrepreneurs is sometimes the increase in production. It should be borne in mind that the results of sales may have a positive or negative impact on reproduction. This is related to the price mechanism. In the presented article the directions of use of price factor in stimulation of agrarian entrepreneurship activity are substantiated.

***Keywords:****entrepreneurship, finance, credit, leasing, price, export, import, quota.*